WIKIPEDIA

# Altay dili

Vikipediya, azad ensiklopediya

**Altay dili**, və ya dəqiq olaraq **cənubi altay dili** — iki Dağlıq Altay dillərindən biri, altaylıların əsas dili. Rusiya Federasiyasındakı Altay Respublikasının rəsmi dili. 1948-ci ilədək *oyrot dili* adlanırdı.

| Altay dili | |
|---|---|
| **Təsnifatı** | |
| Nostratik dillər | |
| Altay dilləri | |
| Türk dilləri | |
| Ortaq türk dili | |
| Sibir türk dilləri | |
| Altay dili | |
| **Yazı** | Kiril əlifbası |
| **Glottolog** | alta1276 (http://glottolog.org/resource/languoid/id/alta1276) |

## Mündəricat



## Şərh

Cənubi və şimali altay dilləri ənənəvi olaraq bir altay dili hesab edilirdi. Ancaq türk dillərinin müasir təsnlfatına görə onlar iki müxtəlif dil hesab edilir. Eyni zamanda Rusiyada dialektlərin ayrılmaları da azsaylı xalqların müstəqil dili hesab edilirlər (kumandin, teleut, çelkan və tubalar dilləri).

2010-cu il ümumrusiya əhalinin siyahıya alınmasına görə Rusiyada 55 720 nəfər altay dilin ana dili hesab ediblər.[1]

## Müqayisə

Müqayisə

| Azərbaycanca | Altayca |
|---|---|
| hə | eye (эйе), tye (je) |
| yox | tyok (joк) |
| yaxşı | tyakşı (jакшы) |
| yaman *(yəni "pis")* | tyaman (jаман) |
| yaramaz | tyarabas (jарабас), tyaramas (jарамас)<br>*(Qeyd: altay dilində "tyarabas (jарабас)" sözü sifət sözdür və "yaramaz, uyğun gəlməyən, tərbiyəsiz" kimi mənalar daşıyır; "tyaramas (jарамас)" sözü isə isimdir və "qanunsuzluq, özbaşınalıq" deməkdir)* |
| mən | men (мен) |
| sən | sen (сен) |
| o; *həmçinin* ol ("o" sözünün arxaik halı, hazırda bəzən poeziyada istifadə edilir) | ol (ол) |
| biz | bis (бис) |
| siz | sler (слер) |
| onlar | olor (олор) |
| kim | kem (кем) |
| nə | ne (не) |
| hara | kaydaar (кайдаар) |
| harada | kayda (кайда) |
| necə | kanayda (канайда) |
| hansı, hankı | kandıy (кандый) |
| haçan *(yəni "nə zaman, nə vaxt")* | kaçan (качан) |
| indi | emdi (эмди) |
| ora | arı (ары) |
| bura, bəri | beri (бери) |
| bu | bu (бу) |
| üçün, -çün | uçun (учун) |
| -la / -lə *(tərzi-hərəkət zərfi)*, ilə | la (ла), lo (ло), lö (лӧ) |
| -mı / -mi / -mu / -mü (*sual ədatı*) | ba (ба), be (бе), bo (бо), bö (бӧ) |
| da, də *(bağlayıcı söz; "o da", "bu da", "mən də" sözlərindəki kimi)* | da (да), de (де), do (до), dö (дӧ) |
| ən | enq (эҥ) |
| bütün | büdün (бӱдӱн) |
| yarı, yarım, yarımçıq | tyarım (jарым) |

| | |
|---|---|
| hamı | kamık (камык) *(çoxmənalı və omonim sözdür)*<br><br>*(Qeyd: bu söz altay dilindəki digər mənaları ilə yanaşı, "çox" (sifət) və "çoxluq" (isim) mənalarında da istifadə edilir)* |
| yalın *(yəni "lüt, açıq" mənasında; "ayaqyalın/yalınayaq" ifadəsindəki kimi)* | tyılanqaş (јылаҥаш) |
| ayrı | ayrı (айры) *(omonim sözdür)* |
| böyük | biyik (бийик) |
| ulu | ulu (улу) |
| kiçik | kiçü (кичӱ), kiçinek (кичинек) |
| alt | aldı (алды)<br><br>*(Qeyd: bu söz altay dilində omonim sözdür, və ikinci mənası "qabaq, ön"dür)* |
| üst, üstündə | üst (ӱст), üstinde (ӱстинде) |
| üzəri | üzeeri (ӱзеери) |
| az | as (ас) *(omonim sözdür)* |
| çox | çok- (чок-)<br><br>(*Qeyd: bu söz altay dilində "bir topa*[2]*ya yığmaq, toparlamaq" mənasında işlənən feldir, və azərbaycan və türk dillərindən fərqli olaraq ayrıca sifət kimi istifadə edilmir; lakin bu söz ilə eyni kökdən olan və bu sözə mənaca yaxın olan bir neçə digər sözlər var, məsələn:*<br><br>*- "çoqu(m)" (чогу(м)), yəni "topa, qalaq, yığın"*<br><br>*- "çoqul" (чогул), yəni "bir topaya yığılmaq, çoxlu camaatla dolmaq"*<br><br>*- "çoquntı" (чогунты), yəni "topa, kütlə"*<br><br>*Ümumiyyətlə, semantik baxımdan "topa" sözünün işləndiyi şəkildə işlənir.*<br><br>*Lakin altay dilində həmçinin "çox" sözüylə əlaqədar ola bilən "sok" (сок) sözü də mövcuddur ki, o qüvvətləndirici ədat şəklində istifadə olunur; məsələn, "yeganə, tək, yapyalnız, tənha" mənalarındakı "sok tyanqıs" (сок јаҥыс) sözündəki kimi*) |
| köp | köp (кӧп) (*çoxmənalı sözdür)*<br><br>*(Qeyd: müasir türk dillərinin əksəriyyətində olduğu kimi, altay dilində də "çox" mənasında "çox" sözüylə qohum olan istənilən bir sözün yerinə "köp" sözü (sifət halında) işlədilir. Azərbaycan dilində "köp" sözü isim olaraq "şiş, qabarma; qarının qazla dolma nəticəsində qabarması, köpməsi" mənasına gəlir və "köpmək" feli ilə yalnız bu mənalarda sıx-sıx istifadə edilir. Altay dilində buna oxşar məna həmçinin "köp-" (кӧп-) felində görülür)* |

| | |
|---|---|
| | |
| arıq | arık (арык) |
| yeni | tyanqı (jаңы) |
| yepyeni | tyap-tyanqı (jап-jаңы) |
| yaraşıqlı | tyaraş (jараш) *(çoxmənalı sözdür)*<br>*(Qeyd: bu söz altay dilində (sifət halında) "yaraşıqlı, gözəl" mənasında işlənir)* |
| çürük | çirik (чирик) |
| qalın | kalınq (калыҥ) |
| yoğun | tyoon (jоон) |
| uzun | uzun (узун) |
| uzaq, iraq | uzak (узак), ıraak (ыраак) |
| yovuq *(yəni "yaxın")*[3] | tyuuk (jуук) |
| qısa | kıska (кыска) |
| dar | tar (тар) |
| ağır | uur (уур) |
| qoyu *(yəni "tünd, qatı"*[4]*; türk dilindəki "koyu" (məsələn "koyu renk") ilə eynidir)* | koyu (койу)<br>*(Qeyd: bu söz altay dilində "sıx, qatı" (rusca "qustoy" (густой) mənasında işlənir)* |
| yüngül | tyenqil (jеҥил) |
| arıq | arık (арык) |
| artıq *(həm isim, həm sifət mənalarında)* | artık (артык) *(çoxmənalı sözdür)* |
| iç, içəri | iç (ич) (*omonim sözdür)* |
| yalnız, yalqız | tyanqıs (jаҥыс) |
| əkiz | igis (игис), *həmçinin* ikre (икре) |
| çin *("doğru, gerçək, həqiqi" mənalarında, məsələn "arzularınız çin olsun" ifadəsindəki kimi)* | çın (чын) |
| boş | boş (бош) |
| dolu | tolo (толо) |
| düz | tüs (тӱс) |
| dümdüz, düpdüz, düppələmdüz | tüp-tüs (тӱп-тӱс) |
| tən, dənk *(yəni "bərabər")* | tenq (теҥ); *həmçinin* tünqey (тӱҥей)<br>*(Qeyd: "tünqey (тӱҥей)" sözü altay dilində "oxşar, bənzər; eyni olan; fərq eləməz" mənalarında işlədilir)* |

| | |
|---|---|
| dəyirmi (*yəni "yumru, yuvarlaq"*) | bolçok (болчок), tegelik (тегелик), tegerik (тегерик), toqolok (тоголок), tulku (тулку) |
| quru | kuru (куру)<br><br>*(Qeyd: bu söz altay dilində "boş" mənasında istifadə edilir)* |
| quraq | kurqak (кургак) |
| yaş *(yəni "nəm, sulu")* | tyaş (јаш) (*omonim sözdür)* |
| özgə *(yəni "başqa, digər, yad, doğma olmayan")* | öskö (öскö) |
| ögey | ööy (ööй) |
| öksüz *(yəni "yetim, kimsəsiz")*[5] | öskür (öскӱс), *həmçinin* ösküs-tyabıs (öскӱс-јабыс) |
| dul *(yəni "həyat yoldaşı vəfat etmiş")* | tul (тул) |
| ölü | ölü (öлӱ) |
| diri | tirü (тирӱ) |
| əsən *(yəni "sağ, salamat"*[6]; *vaxtilə "əsənlik" formasında "salam" mənasında da istifadə edilirdi, bu cür istifadəsi məsələn türk dilinin dialektlərində də "esen, esenlik" şəkillərində görülür*[7]*)* | ezen (эзен)<br><br>*(Qeyd: bu söz altay dilində sifət olaraq "sağ, sağlam, salamat, gümrah" mənalarında, isim olaraq isə salamlaşmaq üçün "salam, salam əleyküm" ifadəsi şəklində istifadə olunur)* |
| səmiz *(yəni "kök")*[8] | semis (семис) |
| arı *(yəni "təmiz, saf")* | aru (ару) |
| isti *(həm sifət, həm isim mənalarında)* | izü (изӱ)<br><br>*(Qeyd: bu sözün isim halı bir neçə türk dillərində, o cümlədə türk dilində mövcud olan "ısı" şəklinə quruluşu baxımından nisbətən daha yaxındır)* |
| ilıq | tyılu (јылу) |
| soyuq | sook (соок) |
| qatı *(yəni "bərk, möhkəm")* | katu (кату) |
| iti | ödü (öдӱ) |
| bərk | bek (бек) |
| yumşaq | tyımjak (јымжак) |
| yavaş | tyoboş (јобош)<br><br>*(Qeyd: bu söz altay dilində həm də fel şəklində ("tyoboş-" (јобош-)) "yavaşlamaq, sakit olmaq" mənalarında da işlənir)* |
| yetər | tyeder (једер) |
| gərək | kerek (керек) |
| ər, erkək | er (эр) |

| | |
|---|---|
| dişi | tiji (тижи) |
| bəy | biy (бий) |
| gəlin | kelin (келин) |
| bahadur *(yəni "qoçaq, qorxmaz")* | baatır (баатыр) |
| yiyə *(yəni "nəyinsə sahibi")* | ee (ээ) |
| ata | ada (ада) |
| ana; *həmçinin* aba *(dial.)* | enye (эне) |
| bala | bala (бала) |
| bəbə, bəbək | baay (баай), baabıy (баабый) |
| oğul | uul (уул) |
| oğlan | uulan (уулан) *(omonim sözdür)* |
| qız | kıs |
| dədə *("baba" [yəni "atanın atası, ananın anası"] mənasında)* | taada (таада) |
| dayı | taay (таай) |
| yengə | tyenqe (јеҥе) |
| yeznə | tyeste (јесте) |
| quda | kudaqay (кудагай) |
| bacanaq | batya (баја) |
| kişi *("insan" mənasında)* | kiji (кижи) |
| igid | tyiit (јиит)<br>*(Qeyd: bu söz altay dilində (bir çox müasir türk dillərində olduğu kimi) "cavan; cavan oğlan" mənalarında istifadə edilir)* |
| yoldaş | tyoldoş (јолдош) |
| toy | toy (той) |
| ad | at (ат) *(omonim sözdür)* |
| Tanrı | Tenqeri (Теҥери) |
| qul *(yəni "qulluq edən, qul olan kimsə; nökər, kölə")* | kul (кул) |
| çəri *(yəni "qoşun, ordu")* | çerü (черӱ) |
| qaçqın | kaçkın (качкын) |
| iş | iş (иш) |
| işçi | işçi (ишчи) |
| öyrənci *(yəni "öyrənən, şagird")* [9] | ürençik (ӱренчик), üreneeçi (ӱренеечи)<br>*(Qeyd: bu iki söz çox yaxın mənalarda istifadə olunurlar. Belə ki, "ürençik" (ӱренчик) sözü altay dilində "şagird, təhsil alan" mənalarında, "üreneeçi" (ӱренеечи) sözü isə "təhsil alan, şagird, tələbə" mənalarında istifadə olunur.)* |

| | |
|---|---|
| oğru *(həmçinin "oğurçu/oğruçu" (xalq arasında istifadə edilən variantlar))* | uurçı (уурчы) |
| oğurluq | uurı (ууры) |
| dilmanc *(yəni "tərcüməçi, mütərcim")* | tilmeş (тилмеш)<br><br>*(Qeyd: altay dilində bu mənada həmçinin "köçüreeçi" (кӧчӱреечи) (hərfi tərcüməsi "köçürücü", görünür ki rus dilindəki "perevodçik" (переводчик) sözünün hərfi tərcüməsidir) sözü istifadə olunur.* |
| söz | sös (сӧс) |
| söyüş | sögüş (сӧгӱш)<br><br>*(Qeyd: bu söz altay dilində daha çox "lağ, məzələnmə, ələ salma" və "tənqid, kritika" mənalarında istifadə edilir)* |
| güc | küç (кӱч) |
| car *(yəni "xəbər, elan, bildiriş"; "car çəkmək" ifadəsindəki kimi)* | tyar (јар) *(omonim sözdür)* |
| uc *(yəni "nəyinsə sonu, kənarı, qırağı, nöqtəsi")* | uç (уч) (*omonim sözdür)* |
| iz | is (ис) |
| dilim *(yəni "uzununa dil kimi kəsilmiş parça, ya bu cür hissələrə ayrılmış bir şeyin hər parçası"; "dilim-dilim" ifadəsindəki kimi)* | tilim (тилим)<br><br>*(Qeyd: altay dilində "dilim / tilim" isminin kökündə duran qədim "tili-" (тили-) feli hələ də istifadə edilir (əgər dilimizə bu feli uyğunlaşdırsaq "dilimək" sözü alınar), və bizim dilimizdəki "dilimləmək" (yəni "dilim şəklində doğramaq, dilim-dilim kəsmək") felinin rolunu oynayır)* |
| oyun | oyın (ойын) |
| yarış | tyarış (јарыш) |
| en, enlilik | en (эн)<br><br>*(Qeyd: bu söz altay dilində "parçanın, kətanın eni" mənasında istifadə edilir)* |
| kəndir | kendir (кендир)<br><br>*(Qeyd: bu söz altay dilində "kənaf bitkisi, kənafkimilər" mənalarında istifadə olunur. Həmçinin qeyd etmək lazımdır ki, azərbaycan dilinin özündə də "kəndir" sözü əslində bir bitki adı kimi istifadə olunur (bax kəndir, kəndirkimilər, kəndirotu))* |
| düyün | tüyün (тӱйӱн) |
| səs | |
| küy *("səs" mənasında; "səs-küy" ifadəsindəki kimi)* | küü (кӱӱ) |
| sabun | samın (самын) |

| | |
|---|---|
| kükürd | |
| şəkər | çikir (чикир) |
| sağ *(yəni "sağ tərəf")* | |
| sol *(yəni "sol tərəf")* | sol (сол) |
| solaxay | soloqoy (сологой) |
| orta | orto (орто) |
| güzgü | küskü (кӱскӱ)<br>*(Qeyd: altay dilində "güzgü, ayna" mənasında "küskü" sözüylə yanaşı həmçinin "körnöş" (кӧрнӧш) sözü istifadə olunur)* |
| daraq | |
| börk *(yəni "papaq")* | börük (бӧрӱк) |
| köynək | künek (кӱнек) |
| geyim | kiyim (кийим) |
| tük, tüklü *(həmçinin "tükdü" (xalq arasındakı tələffüz variantı))* | tük (тӱк), tüktü (тӱктӱ) |
| saç | çaç (чач) *(omonim sözdür)* |
| saqqal | saqal (сагал), *həmçinin* tyaak saqal (јаак сагал) *[hərfi tərcüməsi - "yanaq saqqal"]* |
| baş | baş (баш) |
| başçı | başçı (башчы) |
| beyin | mee (мее) |
| üz | tyüs (јӱс) (*omonim sözdür*) |
| göz | kös (кӧс) |
| yaş *("göz yaşı" mənasında)* | tyaş (јаш) (*omonim sözdür)* |
| qabaq *("qaş" mənasında; "qaş-qabaq" ifadəsindəki kimi)* | kabak (кабак) |
| kirpik | kirbik (кирбик) |
| iy *(yəni "qoxu")* | tyıt (јыт) |
| tumov *(yəni "zökəm")*[10] | tımu (тыму) |
| qulaq | kulak (кулак) |
| yanaq | tyaak (јаак) |
| dodaq | |
| dil | til (тил) |
| diş | tiş (тиш) |
| azı, azıdişi *(yəni "ağzın hər iki tərəfində altda və üstdə olub, yeyilən şeyi çeynəməyə məxsus dişlər", "orta dişlər", "premolyar dişlər")* | azu (азу)<br>*(Qeyd: bu söz altay dilində "köpək diş", "qaflan diş", "ağzın hər iki tərəfində azı dişlərlə ön dişlər arasında olan diş(lər)" mənasında istifadə edilir)* |
| | |

| | |
|---|---|
| ağız | oos (оос) |
| boğaz | |
| çənə | |
| qan | kan (кан) |
| damar | tamır (тамыр) |
| dəri | tere (тере) |
| tər *("xüsusi dərialtı vəzilərin ifraz etdiyi şəffaf maye" mənasında)* | ter (тер) *(omonim sözdür)* |
| sümük | söök (сӧӧк) *(çoxmənalı sözdür)* |
| qabırğa | kabırqa (кабырга) |
| arxa | arka (арка) *(çoxmənalı sözdür)* |
| bel | bel (бел) |
| qol | kol (кол)<br><br>*(Qeyd: bu söz həm altay dilində, həm də müasir türk dillərinin əksəriyyətində həm "əl", həm "qol" mənasında istifadə edilir, yəni bu dillərdə əl ilə qol arasında ayrım itib; altayca həmçinin "çayın qolu" mənasında "kool (коол)" sözü işlədilir)* |
| ovuc | uuş (ууш)<br><br>*(Qeyd: bu söz altay dilində məhz "əlin içi tutan qədər, ovuca yerləşən miqdar (adətən saylarla)" (məsələn "Bir ovuc") mənasında istifadə edilir)* |
| barmaq | |
| dırnaq | tırmak (тырмак) |
| ayaq | |
| qıç, bud | |
| diz | tize (тизе) |
| öfkə *(yəni "ağciyər")* | ökpö (ӧкпӧ) |
| boyun | moyın (мойын) |
| döş | töş (тӧш) |
| əmcək | emçek (эмчек) |
| əmzik | umçı (умчы) |
| köks *(yəni "sinə")* | kögüs (кӧгӱс)<br><br>*(Qeyd: bu söz altay dilində həmçinin "müdriklik, zehin" mənalarında da istifadə edilir)* |
| ürək | tyürek (јӱрек) |
| qarın | karın (карын) |
| tırıq[11] *(yəni "diareya, ishal")*[12] | tırık (тырык) |

| | |
|---|---|
| | *(Qeyd: bu söz altay dilində "qəbizlik[13], pəndəm, konstipasiya, qarının tutulması" (rusca "zapor" (запор)) mənalarında işlənir)* |
| bağır *(yəni "ciyər, qaraciyər")* | buur (буур) |
| böyrək | böörök (бөөрөк) |
| öd, öd kisəsi | öt (өт) *(omonim sözdür)* |
| yol | tyol (јол) |
| il | tyıl (јыл) |
| yaş *("doğuluş, dünyaya gəlmə günündən keçən vaxt, il; insanın, heyvanın, bitkinin böyüməsində, inkişafında dövr; ömür" mənasında; məsələn "Yaşın neçədir?", "Onun 20 yaşı var" kimi)* | tyaş (јаш) *(omonim sözdür)* |
| yaşıd *(yəni "bir başqası ilə bir yaşda olan (adam), həmyaş")* | tyajıt bala, tyajıt kiji (јажыт бала, јажыт кижи) *(omonim sözdür)*<br>*(Qeyd: altay dilində "tyajıt" (јажым) sözü təklikdə işləndikdə "sirr" mənasında istifadə edilir; bu omonim sözdür, yaş mənasındakı sözün kökü "yaş-" sözündən, sirr mənasındakının isə "gizlətmək" mənasındakı "yaş-/yaşı-/yaşır-" kökündən (azərbaycan dilindəki "yaşmaq"[14] (isim) və "yaşırmaq"[15] (fel) sözlərindəki kimi) ibarətdir)* |
| yuxu | uyku (уйку) |
| gecə | |
| gün, günəş, gündüz | kün (кӱн) |
| bu gün / bugün | bügün (бӱгӱн) |
| bugünkü | bügüngi (бӱгӱнги) |
| ertə | erte (эрте) |
| ay | ay (ай) |
| ulduz | tyıldıs (јылдыс); *həmçinin* çolmon (чолмон)*(dilimizdəki "çolpan" (Venera planetinin digər adı) sözüylə eynidir)* |
| su | suu (суу) |
| köpük | köbük (кӧбӱк) |
| çay *("isti içki" mənasında)* | |
| çay *("axarsu" mənasında)* | |
| yar *("suyun yuyub apardığı yer, sahil" mənasında; əsasən dilimizin dialektlərində (məsələn, İrəvan dialektində[16]), habelə Azərbaycanın və bir çox türk xalqlarının yaşadığı bölgələrin toponimikasında görülən bir sözdür)* | tyar (јар) *(omonim sözdür)* |
| yaxa (*yəni "sahil, kənar, tərəf, qıraq; paltarın boyun keçən* | tyaka (јака) |

| | |
|---|---|
| *hissəsi, habelə bu hissəyə tikilən və boyunu əhatə edən parça zolağı"*) | |
| yan (*yəni "tərəf, ətraf, kənar, künc"; "o yanda", "bu yanda" sözlərindəki kimi)* | tyan (јан) |
| göl | köl (кӧл) |
| dəniz | tenqis (теҥис)<br><br>*(Qeyd: bu söz altay dilində "okean" mənasında istifadə edilir; "dəniz" mənasında isə monqol mənşəli "talay (талай)" sözü istifadə olunur)* |
| sal *("üzərində suda üzmək, şey daşımaq və ya bir sahildən o biri sahilə keçmək üçün bir və ya bir neçə sıra bir-birinə bağlanmış şalbanlardan ibarət nəqliyyat vasitəsi" mənasında)* | |
| gəmi | keme (кеме)<br><br>*(Qeyd: bu söz altay dilində "qayıq" mənasında istifadə olunur; "gəmi" mənasında isə rus dilindəki "korabl'" (корабль) sözündən alınma olan "kerep" (кереп) sözü istifadə olunur)* |
| göy | kök (кӧк)<br><br>*(Qeyd: bu söz çoxmənalı sözdür; belə ki, bizim dilimizdə də olduğu kimi, altay dilində də bu söz həm "göy/mavi rəng", həm də "yaşıllıq, göyərti" mənalarında istifadə olunur, və bundan başqa dilimizdəki "kökləmək" sözündə görülən mənaya oxşar şəkildə altayca "tikiş" mənasını da verir)* |
| yaşıl | tyajıl (јажыл) |
| ağ | ak (ак) (*omonim sözdür)* |
| apağ, ağappaq | ap-ak (ап-ак), ak-ak (ак-ак) |
| qara | kara (кара) |
| sarı | sarı (сары) |
| qızıl *(yəni "qırmızı"; "qızıl" sözünün dilimizdə artıq köhnəlmiş mənası)* | kızıl (кызыл) |
| qonur *(yəni "qəhvəyi rəng")* | konqır (коҥыр)<br><br>*(Qeyd: bu söz altay dilində "tünd-şabalıdı rəng" mənasında istifadə olunur)* |
| kürən *(yəni "saçı, tükü parıltı sarı, qırmızı rəngdə olan"; məsələn: Kürən at.)* | kürenq (кӱреҥ) |
| dəmir | temir (темир) |
| | |

| | |
|---|---|
| polad | bolot (болот) |
| qapı | |
| eşik *(yəni "qapı")* | ejik (эжик) |
| körpü | kür (кӱр) |
| yastıq | tyastık (јастык) |
| ev *(həmçinin* öy *(dialekt söz))* | üy (ӱй) |
| yuva | uya (уйа) |
| yurd | tyurt (јурт)<br><br>*(Qeyd: bu söz altay dilində əsasən "kənd, yaşayış məntəqəsi" mənalarında işlənir)* |
| türmə | türme (тӱрме) |
| qat *(yəni "təbəqə, lay"; həmçinin "mərtəbə"*[17] *[köhnəlmiş/nadir hallarda işlənilən mənası, türk dilindəki "kat" sözündəki kimi; məsələn "Ben üst katda oturuyorum.", yəni "Mən yuxarı mərtəbədə qalıram."])* | kat (кат) *(omonim sözdür)*<br><br>*(Qeyd: bu söz altay dilində həm "təbəqə, lay", həm də (bizim dilimizdə də belə mənasının mövcud olmasına baxmayaraq, o mənada adətən istifadə edilməyən, və əksinə olaraq, həmin mənada daha çox türk dilində rast gəlinən) "mərtəbə, binanın mərtəbəsi" mənalarında işlədilir.)* |
| kömür | kömür (кӧмӱр) |
| baqır *(yəni "mis")* | |
| altun *(yəni "qızıl")* | altın (алтын) |
| gümüş | kümüş (кӱмӱш)<br><br>*(Qeyd: altay dilində "gümüş" mənasında əslən monqol dillərindən (müqayisə üçün: monqolca (xalx monqolcası) - möngö (мөнгө); buryatca - "müngen" (мүнгэн); kalmıkca - "mönqgn" (мөңгн)) olan "mönqün" (мӧҥӱн) sözü istifadə olunur)* |
| inci | tyintyi (јинји) |
| üzük | tyüstük (јӱстӱк) |
| qazan | kazan (казан) |
| qapaq | kakpak (какпак) |
| qarmaq | karmak (кармак) |
| ələk *(yəni "xəlbir", "süzgəc")* | elgek (элгек) |
| küp | küp (кӱп)<br><br>*(Qeyd: bu söz altay dilində "çegen (чеген; rusca "çegen"' (чегень)) (altaylıların mətbəxinə xas olan, ayrana və qımıza bənzər süd məhsulu olan içki) saxlanılması üçün saxsı qab" mənasında istifadə edilir)* |
| qalpaq | kalbak (калбак) |

| | |
|---|---|
| | *(Qeyd: bu söz altay dilində "qaşıq" mənasında işlənir)* |
| qamçı | kamçı (камчы) |
| bıçaq | bıçak (бычак) |
| qayçı | kayçı (кайчы) *(çoxmənalı və omonim sözdür)* |
| iynə | iyne (ийне) |
| balta | malta (малта) |
| sap *("bir şeyin əl tutulan yeri, tutacaq yeri, qulpu" mənasında, məsələn "Baltanın sapı.")* | sap (сап) *(çoxmənalı sözdür)* |
| kürək *("qazı aləti" mənasında)* | kürek (кӱрек) |
| deşik | tejik (тежик) |
| oyuq | oyık (ойык), oydık (ойдык) |
| dağ | tuu (туу) |
| yer | tyer (јер) |
| torpaq | tobrak (тобрак)<br>*(Qeyd: bu söz altay dilində "toz" mənasında işlənir)* |
| yük | tyük (јӱк) |
| daş | taş (таш) |
| toz | |
| duz | |
| yağ | |
| bal | bal<br>*(Qeyd: altay dilində "bal" mənasında əsasən rus dilindəki "myod" (мёд) sözündən alınan "möt" (мӧт) sözü istifadə olunur)* |
| süd | süt (сӱт) |
| qurut | kurut (курут)[18] |
| yumurta | tyımırtka (јымыртка) |
| dad | |
| dadlı | |
| ac | aç (ач) *(çoxmənalı və omonim sözdür)*<br>*(Qeyd: bu söz altay dilində əsasən "xəsis", habelə "ac" mənasında işlənir)* |
| acgöz | aç kös (ач кöс) |
| tox | toyu (тойу) |
| doydurucu | tok (ток), toyu-tok (тойу-ток) |
| acı | açu (ачу) |
| | |

| | |
|---|---|
| şorba | |
| göbələk | |
| soğan | soqono (согоно) |
| yemiş *("meyvə" mənasında)* | |
| qax (*yəni "qurudulmuş meyvə")* | kak (как) *(omonim sözdür)*<br><br>*(Qeyd: bu söz altay dilində qədim mənada, "quru" və "qumlu" mənalarında (yəni sifət şəklində) istifadə edilir)* |
| alma | |
| üzüm | |
| çiyələk, giləmeyvə | tyiilek (јиилек) |
| qarağat | karaqat (карагат) |
| arpa | arba (арба) |
| buğda | buuday (буудай) |
| urluq *("toxum, dənə" mənasında)* | |
| un | |
| dəyirman | teermen (теермен) |
| yem (*yəni "heyvanlara verilən yeyəcək (arpa, ot, saman və s.); quş və heyvanı cəlb etmək üçün tələyə, cələyə, duzağa qoyulan yeyəcək şey"*) | tyem (јем) |
| at | at (ат) *(omonim sözdür)* |
| ilxı | tyılkı (јылкы) |
| qısraq, madyan | |
| yəhər | eer (ээр) |
| üzəngi[19] | üzenqi (ӱзеҥи) |
| yedək[20] | tyedek at (једек ат) |
| yal (*"atın (və bəzi heyvanların) boynunun üst hissəsində bitən uzun tüklər" mənasında*) | tyal (јал) (*omonim sözdür)*<br><br>*(Qeyd: bu söz altay dilində həmçinin "ödəniş, maaş" kimi mənalarda da istifadə edilir.)* |
| yorğa[21] | tyorqo (јорго) / tyorqo at (јорго ат) |
| qulun *(yəni "körpə at balası")* | kulun (кулун) |
| daylaq *(yəni "at balası (altı aylıqdan iki yaşa qədər)")* | tay (тай) *(omonim sözdür)* |
| ceyran | tyeeren (јеерен) |
| maral | maral (марал) |
| it | iyt (ийт) *(omonim sözdür)* |
| küçük *(yəni "itin balası")* | küçük (кӱчӱк) |

| | |
|---|---|
| ilan | tyılan (јылан) |
| balıq | balık (балык) |
| qarışqa | |
| hörümçək | |
| kəpənək | köbölök (көбөлөк) |
| qurd *("həşərat növü" mənasında)* | kurt (курт) |
| bit *("həşərat/parazit növü" mənasında)* | biyt (бийт) |
| aslan, arslan *(yəni "şir")* | arslan (арслан); *həmçinin* karaqula (карагула) |
| tülkü | tülkü (тӱлкӱ) |
| ayı | ayu (айу) |
| quş | kuş (куш) |
| toyuq | takaa (такаа) |
| durna | turna (турна) |
| qaz *("quş növü" mənasında)* | kas (кас) *(omonim sözdür)* |
| göyərçin | küüle (кӱӱле) |
| qu, qu quşu | kuu (куу) *(çoxmənalı sözdür)*<br><br>*(Qeyd: bu söz altay dilində sifət şəklində "ağ (rəngdə olan)", "saçı ağarmış", "üzü ağarmış" mənalarında istifadə edilir)* |
| porsuq | borsık (борсык) |
| qunduz | |
| donuz | |
| inək | uy (уй) |
| buzov | bozu (бозу) |
| buğa | buka (бука) |
| öküz | |
| dəvə | töö (төө) |
| keçi | eçki (эчки) |
| oğlaq *(yəni "çəpiş; körpə, südəmər keçi balası")* | uulak (уулак) |
| təkə *(yəni "erkək keçi", "vəhşi keçi, dağ keçisi")* | teke (теке) |
| əlik *(yəni "vəhşi keçi; keyik")* | elik (элик) |
| qoşqar / qoçqar *(yəni "erkək qoyun"; Şərur dialektində "qoşar" şəklində isə "qoşqu camışı" mənasında) (Azərbaycandakı Qoşqar dağı ilə Qoşqarçay çayı və Türkiyədəki* | koçkor (кочкор) |

| | |
|---|---|
| *Kaçkar dağları adlarında da mövcuddur)* | |
| arğalı *(yəni "vəhşi qoç")*[22] | arkar (аркар) |
| eşşək | |
| qoyun | koy (кой) |
| yun | tyunq (јуҥ)<br>*(Qeyd: bu söz altay dilində "quş tükü" mənasında istifadə olunur)* |
| buynuz | müüs (мӱӱс) |
| quyruq | |
| qanad | kanat (канат); *həmçinin* kurkun (куркун) |
| orman *(yəni "meşə")* | |
| ağac | aqaş (агаш) |
| yarpaq | tyalbırak (јалбырак) |
| qabıq | |
| budaq | budak (будак) |
| taxta | takta (такта)<br>*(Qeyd: bu söz altay dilində "stol, skamya" mənasında istifadə olunur)* |
| odun | odın (одын) |
| dayaq, dəyənək | tayak (тайак) |
| çiçək | çeçek (чечек) |
| düz, düzənlik | tüzenq (тӱзеҥ) |
| bulud | bulut (булут) |
| şimşək, ildırım | |
| yağış, yağmur | tyaaş (јааш), tyanqmır (јаҥмыр) |
| damcı, damla | tamçı (тамчы) |
| palçıq | |
| yel *("külək" mənasında)* | |
| tütün *("tüstü" mənasında)*[23] | tüdün (тӱдӱн) |
| kül | |
| ocaq | oçok (очок) |
| od *(yəni "alov")* | ot (от) *(çoxmənalı sözdür)* |
| buz | |
| qar | |
| qırov | kıru (кыру) |
| qış | kış (кыш) |
| yaz | tyas (јас) (*omonim sözdür)* |
| yay | tyay (јай) (*omonim sözdür)* |

| | |
|---|---|
| güz *(yəni "payız")* | küs (кӱс) |
| qışlaq | kıştu (кышту) |
| yaylaq | tyaylu (јайлу) |
| olmaq | bol- (бол-) |
| demək, ayıtmaq[24] | de- (де-), ayt- (айт-) |
| etmək | et- (эт-) |
| dəymək *("toxunmaq" mənasında)* | tiy- (тий-) |
| baxmaq | |
| görmək | kör- (кӧр-) |
| görünmək | körün- (кӧрӱн-) |
| görkəzmək *(yəni "görsətmək, göstərmək")* | körgüs- (кӧргӱс-) |
| görüşmək | körüş- (кӧрӱш-) |
| görüşdürmək | körüştir- (кӧрӱштир-)<br>*(Qeyd: bu söz altay dilində əsasən "(küsülüləri) barışdırmaq" mənasında işlənir)* |
| yummaq *(yəni "göz qapaqlarını bağlamaq")* | tyum- (јум-) |
| uzanmaq | |
| yatmaq | tyat- (јат-) |
| durmaq | tur- (тур-) *(çoxmənalı sözdür)*<br>*(Qeyd: altay dilində "tur-" (тур-) feli "durmaq, dayanmaq" kimi mənalardan başqa həmçinin "(nədənsə) ibarət olmaq", "xidmət göstərmək, muzdlu iş görmək" kimi mənalarda da istifadə olunur; habelə altay dilində tez-tez köməkçi fel qismində istifadə olunur və hərəkətin müddəti və davamiyyətini bildirir)* |
| durğuzmaq *(həmçinin "durquzmaq" (xalq arasındakı tələffüz variantı))* | turqus- (тургус-) *(çoxmənalı sözdür)*<br>*(Qeyd: bu söz altay dilində həmçinin "qoymaq, dikmək, ucaltmaq ["abidə ucaltmaq" kimi], (nələrisə) düzmək" kimi mənalarda istifadə olunur)* |
| oyanmaq, oyatmaq | oyqon- (ойгон-), oyqos- (ойгос-) |
| dayanmaq *("söykənmək" mənasında)* | tayan- (тайан-) |
| eşitmək | |
| dinləmək | tınqda- (тыҥда-) |
| yemək | tyi- (ји-) |
| yedirmək, yedizdirmək | tyidir- (јидир-) |

| | |
|---|---|
| yalamaq | tyala- (јала-) *(omonim sözdür)*<br><br>*(Qeyd: bu söz altay dilində həmçinin "cəza, ştraf" kimi mənalarda da istifadə edilir.)* |
| içmək | iç- (ич-) (*omonim sözdür)* |
| doymaq | toy- (той-) (*omonim sözdür)* |
| sezmək (*yəni "hiss etmək")*; həmçinin Xanlar/Göygöl dialektində "şübhələnmək" mənasında istifadə olunan "səsiyməx'"[25] sözü | sezin- (сезин-)<br><br>*(Qeyd: "sezin-" (сезин-) sözü altay dilində "hiss etmək, təhmin etmək, şübhələnmək" mənalarında işlədilir. Bu söz ilə eyni kökdən olan və bu sözə mənaca yaxın olan bir neçə digər sözlər var, məsələn:*<br><br>*- "sezik" (сезик), yəni "təhmin, şübhə"*<br><br>*- "seziktü" (сезиктӱ), yəni "təhmin edə bilən"*<br><br>*- "sezim" (сезим), yəni "hiss, hissiyat, təhmin edə bilmə, anlaşılırlıq, anlaq"*<br><br>*- "sezimdü" (сезимдӱ), yəni "həssas, təhmin edə biləcək, anlayışlı, dərrakəli"*<br><br>*- "sezü" (сезӱ), yəni "qəbul etmə, reaksiya, qavrayış, hissiyat")* |
| işləmək *(həmçinin "işdəmək" (xalq arasındakı tələffüz variantı))* | işte- (иште-) |
| başlamaq *(həmçinin "başdamaq" (xalq arasındakı tələffüz variantı))* | başta- (башта-) |
| bağlamaq | buula- (буула-)<br><br>*(Qeyd: bu söz altay dilində "düyün vurmaq", "ip və başqa materiallar vasitəsilə şeyləri bir-birinə rəbt etmək" mənalarında işlənir)* |
| bişmək | bış- (быш-)<br><br>*(Qeyd: bu söz altay dilində əsasən "yetişmək, kal olmamaq [giləmeyvə haqqında]", habelə "bişmək, bişmiş olmaq, hazır olmaq [yemək haqqında]" və onunla yanaşı "qatışdırmaq, süd və ya yağ çalmaq" mənalarında istifadə edilir)* |
| qovurmaq | kaar- (каар-), *həmçinin* kuur- (кууp-)<br><br>*(Qeyd: altay dilində "kaar-" (каар-) sözü "qızartmaq, bişirmək (məsələn əti, kartofu)", və "kuur-" (кууp-) sözü isə konkret olaraq "arpanı qovurmaq" mənalarında işlədilirlər)* |
| qaynamaq | kayna- (кайна-) |

| | |
|---|---|
| qatılaşmaq *(yəni "bərkimək")* | kat- (кат-) *(çoxmənalı omonim sözdür)* |
| almaq | al- (ал-) |
| açmaq | aç- (ач-) |
| qapamaq *(yəni "bağlamaq, örtmək")* | kakpa- (какпа-) |
| acımaq *(yəni "dadı acı olmaq")*, acılaşmaq | açı- (ачы-) |
| minmək | min- (мин-) |
| unutmaq | undı- (унды-) |
| unudulmaq | undıl- (ундыл-) |
| soruşmaq, sormaq *("soruşmaq, sual vermək, sorağını almaq" mənasında)* | sura- (сура-) |
| sormaq *("əmmək" mənasında) (həmçinin "soormaq / sourmaq" (xalq arasındakı tələffüz variantı))* | soor- (соор-) |
| sovurmaq *(yəni "havaya qaldırmaq, səpələmək, dağıtmaq")*[26] | sobır- (собыр-) |
| soymaq | soy- (сой-) |
| solmaq *(yəni "rəngi qaçmaq, rəngini, parlaqlığını itirmək, saralmaq, təravətini itirmək" [məcazi mənada adam haqqında da istifadə edilə bilər])* | sool- (соол-)<br>*(Qeyd: bu söz altay dilində əsasən "buxarlanmaq", habelə "qurumaq" və "solmaq, solub getmək" mənalarında istifadə edilir)* |
| qovalamaq | |
| əkmək | |
| tikmək | |
| dişləmək *(həmçinin "dişdəmək" (xalq arasındakı tələffüz variantı))* | tişte- (тиште-) |
| gəmirmək | tyemir- (јемир-)<br>*(Qeyd: bu söz altay dilində "dağıtmaq, sındırmaq, əzik-üzük etmək" mənalarında işlənir)* |
| ağrımaq | oorı- (ооры-) |
| ağlamaq, ağlatmaq | ıyla- (ыйла-), ıylat- (ыйлат-) |
| qışqırmaq | kışkır- (кышкыр-); *həmçinin* kıyqır- (кыйгыр-) |
| qıdıqlamaq | kıçıkta- (кычыкта-)<br>*(Qeyd: quruluşu baxımından daha çox bu sözə mənaca nisbətən yaxın olan "qıcıqlamaq" sözünü xatırladır)* |
| göyərmək *("göy rəng almaq"* | kögör- (кӧгӧр-) |

| | |
|---|---|
| *mənasında)*, göyləşmək | |
| qızarmaq | kızar- (кызар-) |
| yaşıllanmaq, yaşıllaşmaq, göyərmək *("yaşıllaşmaq" mənasında)* | tyajar- (jажар-) |
| ağarmaq | aqar- (агар-) |
| saralmaq | sarqar- (саргар-)<br><br>*(Qeyd: bu söz quruluşu baxımından türk dilindəki "sararmak" şəklinə nisbətən daha yaxındır)* |
| boyamaq | budı- (буды-) |
| əmmək | em- (эм-) |
| əmizmək, əmizdirmək | emis- (эмис-) |
| tapmaq | tap- (тап-) |
| tapılmaq | tabıl- (табыл-) |
| daramaq | tara- (тара-) |
| tüpürmək | tükür- (тӱкӱр-)<br><br>*(Qeyd: bu söz quruluşu baxımından "tüpürmək" sözünün türk dilindəki variantı olan "tükürmek" sözünə (ki belə variant bir çox digər türk dillərində də görülür) yaxındır)* |
| tıxmaq *(yəni "(acgözlüklə) yemək")* | tık- (тык-) |
| dammaq, damcılamaq | tam- (там-), tamçıla- (тамчыла-) |
| gəyirmək | kegir- (кегир-) |
| asqırmaq | askır- (аскыр-); *həmçinin* çüçkür- (чӱчкӱр-) |
| üfürmək, üfləmək | ür- (ӱр-) *(omonim sözdür)* |
| hürmək | ür- (ӱр-) *(omonim sözdür)* |
| fışqırmaq, fısqırmaq *(yəni "fit çalmaq")* | sıqır- (сыгыр-) |
| kişnəmək | kişte- (киште-) |
| əsnəmək | este- (эсте-) |
| silkələmək, silkələnmək | silki- (силки-), silkin- (силкин-) |
| gülümsəmək, gülümsünmək | külümziren- (кӱлӱмзирен-)<br><br>*(Qeyd: "külümziren-" (кӱлӱмзирен-) sözü altay dilində "gülümsəmək, təbəssüm etmək" mənalarında işlədilir. Bu söz ilə eyni kökdən olan və bu sözə mənaca yaxın olan bir neçə digər sözlər var, məsələn:*<br><br>*- "külümtyi" (кӱлӱмjи), yəni "təbəssüm"*<br><br>*- "külümtyilü" (кӱлӱмjилӱ), yəni "təbəssümlü, təbəssüm ilə"* |

| | |
|---|---|
| | *Altay dilində "gülmək" felinin kökü olan "gül-" sözü müstəqil olaraq işlənmir; habelə, altay dilində "gülmək, qəhqəhə etmək" mənasında "katkır-" (катқыр-) sözü istifadə edilir.)* |
| güdmək | küt- (кӱт-) |
| iyləmək | tyıta- (јыта-), tyıtkar- (јыткар-) |
| qoşmaq, qoşulmaq | koş- (кош-) *(çoxmənalı sözdür)*, kojul- (кожул-) |
| qaçmaq | kaç- (кач-) |
| qaçırmaq | kaçır- (качыр-) |
| aparmaq | apar- (апар-) |
| daşımaq | tajı- (тажы-)<br><br>*(Qeyd: bu söz altay dilində əsasən "şapalaq vurmaq, əlin içi ilə nəyisə vurmaq", habelə "daşımaq, harasa aparmaq" mənalarında istifadə edilir)* |
| dərmək *("meyvə, çiçək və s.-ni birbir qoparmaq, toplamaq" mənasında)* | ter- (тер-) *(omonim sözdür)* |
| bilmək | bil- (бил-) |
| öyrənmək | üren- (ӱрен-) |
| öyrətmək | üret- (ӱрет-) |
| söz vermək | sös ber- (сӧс бер-) |
| anlamaq | |
| aldatmaq | |
| qorxmaq | korkı- (коркы-) |
| ürkmək, hürkmək *(yəni "gözlənilməz səsdən, adamdan və s.-dən qorxub çəkilmək və ya qaçmaq; ürkmək, qorxmaq (heyvanlar və quşlar haqqında)")* | ürki- (ӱрки-)<br><br>*(Qeyd: bu söz altay dilində məhz heyvanların qorxması/ürkməsi ilə bağlı olan sözdür və yalnız heyvanlara şamil edilir; azərbaycan dilində isə bu söz öz ilkin mənasından başqa həmçinin insanlara da aid edilir)*[27] |
| azmaq *(yəni "yolunu itirmək, qeyb olmaq, düz yoldan sapmaq")* | as- (ас-) |
| titrəmək | |
| enmək | |
| tərləmək | terle- (терле-) |
| tökmək | tök- (тӧк-) |
| tökülmək | tögül- (тӧгӱл-) |
| yağmaq *(yəni "havadan qar, yağış, dolu kimi şeylər düşmək", "çox miqdarda, arası kəsilmədən tökülmək")* | tyaa- (јаа-) |

| | |
|---|---|
| bulamaq | bulqa- (булга-) |
| doğmaq | tuu- (туу-) |
| doğulmaq | tuul- (туул-) |
| yaşamaq | tyaja- (јажа-) |
| qarımaq *(yəni "qocalmaq")* | karı- (кары-) |
| ölmək, öldürmək | öl- (ӧл-), öltür- (ӧлтӱр-) |
| savaşmaq | |
| vuruşmaq | uruş- (уруш-) *(çoxmənalı sözdür)*<br><br>*(Qeyd: bu söz altay dilində həmçinin "qoşulmaq" mənasında da istifadə edilir)* |
| udmaq *("qalib gəlmək, qələbə çalmaq" mənasında)* | tyut- (јут-)<br><br>*(Qeyd: bu söz altay dilində istifadəsi kobud sayılan sözdür)* |
| güləşmək | küreş- |
| boğmaq | buur- (буур-) *(omonim sözdür)* |
| təpmək, təpikləmək, təpik vurmaq | tep- (теп-) |
| axsamaq | aksa- (акса-) |
| qaxmaq *(yəni "var gücü ilə bir şeyi bir yerə vurmaq, çırpmaq", "çalmaq, vurmaq, sancmaq, girdirmək")*[28] | kak- (как-) *(omonim sözdür)* |
| əsmək | es- (эс-)<br><br>*(Qeyd: bu söz altay dilində "sovurmaq" mənasında istifadə olunur)* |
| burmaq | |
| buraxmaq | |
| bükmək | bük- (бӱк-) *(çoxmənalı sözdür)* |
| kəsmək | kes- (кес-) |
| kəsilmək | kezil- (кезил-) |
| soxmaq | sok- (сок-) *(çoxmənalı və omonim sözdür)*<br><br>*(Qeyd: bu söz altay dilində əsas olaraq "döymək, vurmaq, zərbə yetirmək" kimi mənalarda işlənir)* |
| soxulmaq | soqul- (согул-)<br><br>*(Qeyd: bu söz altay dilində "vurulmaq, döyülmək" mənasında işlənir)* |
| batmaq | bat- (бат-) *(çoxmənalı və omonim sözdür)* |

| | |
|---|---|
| | *(Qeyd: bu söz altay dilində "nəyəsə yerləşmək" və "qürub etmək, gözdən itmək" ("günəşin batması" ifadəsindəki kimi)[29] mənalarında istifadə edilir)* |
| batırmaq | badır- (бадыр-)<br><br>*(Qeyd: bu söz altay dilində "salmaq, yerləşdirmək" mənalarında istifadə edilir)* |
| cırmaqlamaq, dırnaqlamaq | tırma- (тырма-); tırman- (тырман-) *("qaşınmaq" mənasında)* |
| üzülmək *("cırılmaq, süzülmək, qırılmaq, yıpranmaq" mənalarında)* | üzül- (ӱзӱл-) |
| sınmaq | sın- (сын-) |
| sındırmaq | sındır- (сындыр-) |
| sökülmək | sögül- (сӧгӱл-)<br><br>*(Qeyd: bu söz altay dilində daha çox "parçanın, geyimin sökülməsi" ilə bağlı mənalar daşıyır)* |
| süpürmək | sibir- (сибир-) |
| ayırmaq | ayrı- (айры-) |
| bölmək | böli- (бӧли-); *həmçinin* üle- (ӱле-), üleş- (ӱлеш-)<br><br>(*Qeyd: "üle-" (ӱле-) və "üleş-" (ӱлеш-) sözləri həm qədim türk yazılı abidələrində keçən, həm də bir neçə digər türk dillərində qorunub saxlanan "ülüş", "üləşmək" sözləriylə eyni kökə sahibdirlər.* |
| bölünmək | bölin- (бӧлин-) |
| yarmaq *("qırmaq, yarıya bölmək, ayırmaq" mənalarında)* | tyar- (јар-)<br><br>*(Qeyd: bu söz altay dilində "deşmək, iynələmək; qırmaq, sındırmaq" kimi mənaları daşıyır)* |
| yaramaq *(yəni "yararlı, xeyirli olmaq")* | tyara- (јара-) |
| yaraşmaq | tyaraş- (јараш-) *(çoxmənalı sözdür)*<br><br>*(Qeyd: bu söz altay dilində (fel halında) "bir-birini bəyənmək, bir-birindən xoşu gəlmək" mənasında işlənir)* |
| yaşırmaq *(yəni "gizlətmək")* | tyajır- (јажыр-) |
| yırtmaq | tyırt- (јырт-) |
| yırtılmaq | tyırtıl- (јыртыл-) |
| yortmaq[30][31] | tyort- (јорт-) |
| köklәmәk *(həmçinin "kökdəmək" (xalq arasındakı tələffüz variantı))* | köktö- (кӧктӧ-) |
| | |

| | |
|---|---|
| oymaq, ovmaq *(ikisi də "deşmək" mənasında)* | oy- (ой-) |
| qazmaq | kas- (кас-) *(omonim sözdür)* |
| gömmək | köm- (көм-) |
| üzmək *("suda üzmək, su ilə hərəkət etmək" mənasında)* | tyüs- (jӱс-) (*omonim sözdür)* |
| axmaq *("suyun, mayenin axması" mənasında)* | ak- (ак-) |
| uçmaq | uç- (уч-) |
| yetmək | tyet- (јет-) |
| yetirmək | tyetir- (јетир-) |
| yerimək | tyeri- (јери-)<br><br>*(Qeyd: bu söz altay dilində konkret olaraq "[heyvanlar haqqında] öz balasını atıb tərk etmək" mənasında işlənir; həmçinin bu cür bir heyvanı bildirən "tyerinqkey" (јериҥкеӣ) isimi də mövcuddur)* |
| yürümək | tyür- (jӱр-) |
| yüyürmək | tyügür- (jӱгӱр-) |
| varmaq *(yəni "harasa getmək, harasa istiqamətlənmək")* | bar- (бар-) |
| getmək | |
| gəlmək | kel- (кел-) |
| qalmaq | kal- (кал-)<br><br>*(Qeyd: bu söz altay dilində həmçinin tez-tez köməkçi fel qismində istifadə olunur və bitmiş, yerinə yetirilmiş bir hərəkəti bildirir)* |
| girmək | kir- (кир-) |
| çıxmaq | çık- (чык)- |
| çıxarmaq | çıqar- (чыгар-) |
| ötmək | öt- (öт-) |
| ötürmək | ötkür- (öткӱр-) |
| sürmək | sür- (сӱр-)<br><br>*(Qeyd: bu söz altay dilində daha çox heyvan sürüsü ilə bağlı olan mənalarda istifadə olunur, yəni müasir azərbaycan dilindəki əsas mənası olan "maşın idarə etmək" mənasında yox)* |
| keçmək | keç- (кеч-) |
| köçmək | köç- (кöч-) |
| köçürmək | köçür- (кöчӱр-) |
| köpmək *(yəni "şişmək")* | köp- (кöп-) (*çoxmənalı sözdür)* |

| | |
|---|---|
| | *(Qeyd: bu söz altay dilində sifət halında "çox" mənasını verir)* |
| səmirmək *(yəni "kökəlmək, gombullaşmaq"), həmçinin* səmizmək (*yəni "yağlanmaq, piylənmək"*) | semir- (семир-) |
| yenmək (*yəni "udmaq, qalib gəlmək, qələbə çalmaq")* | tyenq- (jең-) (*omonim sözdür; digər mənası (isim halında) "paltarın qolu (rusca "rukav (рукав)")"dır)* |
| yaxarmaq *(yəni "israrla yalvarmaq"; "yalvar-yaxar" ifadəsindəki kimi)* | tyakar- (јакар-)<br>*(Qeyd: bu söz altay dilində "əmr etmək, tələb etmək" mənalarında işlədilir)* |
| toxtamaq[32] | tokto- (токто-) |
| düşmək | tüş- (тӱш-) |
| düşürmək, düşürtmək, düşdürmək | tüjür- (тӱжӱр-) |
| dolmaq | tol- (тол-) |
| doldurmaq | toltır- (толтыр-) |
| düzəlmək | tüzel- (тӱзел-) |
| düzəltmək | tüzet- (тӱзет-) |
| vermək | ber- (бер-) |
| götürmək | ködür- (кӧдӱр-) |
| satmaq | sat- (сат-) |
| oğurlamaq | uurda- (уурда-) |
| sağmaq *("südverən heyvanların yelinindən südü süzüb çıxarmaq" mənasında; məsələn "Camışı sağmaq.", "İnəyi sağmaq." kimi)* | saa- (саа-) |
| salmaq | sal- (сал-) |
| tüləmək *(yəni "müəyyən vaxtlarda köhnə tükünü, yununu, qabığını tökmək, təzələmək (heyvanlar və quşlar haqqında)")*[33] | tüle- (тӱле-) |
| dazlanmaq, dazlaşmaq *(yəni "keçəlləşmək, saçları tökülmək")* | taza- (таза-) |
| tutmaq | tut- (тут-) |
| qısmaq | |
| basmaq | bas- (бас-) *(çoxmənalı sözdür)* |
| sıxmaq, sıxılmaq | sık- (сык-), sıqıl- (сыгыл-); *həmçinin* sıqın- (сыгын-) |
| qonmaq | kon- (кон-) |
| oturmaq | otur- (отур-) |
| oturtmaq, otuzdurmaq | oturqıs- (отургыс-) |

| | |
|---|---|
| itələmək | iyt- (ийт-) *(omonim sözdür)*<br><br>*(Qeyd: quruluşu baxımından türk dilində ("itmek" şəklində) və bir neçə digər türk dillərində, habelə azərbaycan dilinin bəzi dialektlərində (məsələn Şəkidə "idmax" şəklində)*[34] *görülən "itələmək" mənasındakı "itmək" sözüylə birdir)* |
| hörmək *("saçları hörmək" kimi)* | ör- (öp-) |
| yolmaq *("saçları yolmaq" kimi)* | tyul- (јул-) |
| yoluxmaq *(yəni "sirayət etmək, keçmək (xəstəlik, mikrob); hal-əhval bilmək üçün birinin yanına getmək (gəlmək)")* [35] | tyolık- (јолык-)<br><br>*(Qeyd: bu söz altay dilində "görüşmək" mənasında işlənir, yəni istifadəsi baxımından azərbaycan dilindəki görüşmək ilə bağlı ikinci mənasından nisbətən fərqlənir; azərbaycan dilindəki xəstəliklərin keçməsi ilə bağlı birinci mənasında altay dilində "tyuquş" (јуғуш) sözü istifadə edilir)* |
| dartmaq | tart- (тарт-)<br><br>*(Qeyd: bu söz altay dilində çoxmənalı sözdür. Belə ki, altayca "tart" sözü həm "özünə tərəf dartıb çəkmək", həm "aparmaq", həm də (bir neçə türk dillərində (məsələn qazax dilində) olduğu kimi) "siqaret çəkmək" mənalarında istifadə olunur. Semantik olaraq bizim dilimizdə "çəkmək" sözünün işləndiyi yerlərdə işlənilir.)* |
| sürtmək | sürt- (сӱрт-) |
| sərmək | |
| sarmaq, sarımaq | |
| səpmək, səpələmək | |
| saçmaq | çaç- (чач-) *(omonim sözdür)* |
| yaymaq | tyay- (јай-) *(omonim sözdür)* |
| yayılmaq | tyayıl- (јайыл-) |
| bürümək | bürke- (бӱрке-) |
| sevmək *(həmçinin "söymək" (dialekt söz, "sevmək" mənasında))* | süü- (сӱӱ-) |
| sevinmək *(həmçinin "söyünmək" (dialekt söz))* | süün- (сӱӱн-) |
| qucaqlamaq, qucaqlaşmaq *(həmçinin "qucaqdamaq, qucaqdaşmaq" (xalq arasındakı tələffüz variantları))* | kuçakta- (кучакта-), kuçaktaş- (кучакташ-) |
| geymək | kiy- (кий-) |
| geyinmək | kiyin- (кийин-) |
| yumaq *("su ilə təmizləmək" mənasında)* | |
| yıxamaq *(yəni "yumaq")* | |

| | |
|---|---|
| yaxalamaq *("yaxasından tutmaq, boğazından yapışmaq; tutmaq, ələ keçirmək" mənalarında)* | tyakala- (јакала-) |
| yığmaq | tyuu- (јуу-) |
| yığılmaq | tyuul- (јуул-) |
| yıxmaq *(yəni "yerə düşməsini, tarazlıqdan çıxmasını sağlamaq, aşırmaq")* | tyık- (јык-) |
| yıxılmaq | tyıkıl- (јыгыл-) |
| yumşalmaq | tyımja- (јымжа-) |
| silmək | |
| atmaq | at- (ат-) (*omonim sözdür*)<br><br>*(Qeyd: bu söz altay dilində (fel halında) "doldurulmuş tüfəngdən, tapançadan, topdan və s. silahdan atəş açmaq" mənasında işlənir)* |
| oynamaq | oyno- (ойно-) *(çoxmənalı sözdür)* |
| donmaq | tonq- (тоҥ-) |
| üşümək | üji- (ӱжи-)<br><br>*(Qeyd: bu söz altay dilində "dondurmaq", "buz bağlamaq" kimi mənalarda istifadə edilir)* |
| soyumaq | |
| soyutmaq | |
| isinmək | izi- (изи-) |
| isitmək | izit- (изит-) |
| ərimək | eri- (эри-) |
| şişmək | |
| say, san | |
| saysız | |
| 1 - bir | bir (бир) |
| 2 - iki | eki (эки) |
| 3 - üç | üç (ӱч) |
| 4 - dörd | tört (тӧрт) |
| 5 - beş | beş (беш) |
| 6 - altı | altı (алты) |
| 7 - yeddi | tyeti (јети) |
| 8 - səkkiz | segis (сегис) |
| 9 - doqquz | toqus (тогус) |
| 10 - on | on (он) |
| 20 - iyirmi | tyirme (јирме) |
| 30 - otuz | odus (одус) |

| | |
|---|---|
| 40 - qırx | törtön (одус) |
| 50 - əlli | bejen (бежен) |
| 60 - altmış | altan (алтан) |
| 70 - yetmiş | tyeten (јетен) |
| 80 - səksən | segizen (сегизен) |
| 90 - doxsan | toquzon (тогузон) |
| 100 - yüz | tyüs (јӱс) (*omonim sözdür*) |
| 1000 - min | munq (муҥ) |

# Həmçinin bax

- Kiril qrafikalı əlifbalı dillər siyahısı
- Şimali Altay dilləri

# Mənbə


- Школьный алтайско-русский словарик (http://altaifonts.narod.ru/slovo.html)
- Кафедра алтайского языка и литературы (http://www.gasu.ru/univer/edu/dep/ff/alt.html) Горно-Алтайского государственного университета
- Алтайский язык в проекте ETHEO (http://etheo.org/alto01.htm) (коротко о грамматике и фонетике, этнические группы)
- Страница Ethnologue для южного алтайского (http://www.ethnologue.com/show_language.asp?code=alt)
- Информация о телеутах на сайте Совета Федерации (http://www.severcom.ru/nations/item29.html)
- Телеутский язык (http://lingsib.unesco.ru/ru/languages/teleut.shtml.htm)


# Ədəbiyyat


- Баскаков Н. А. Алтайский язык. — М., 1958.
- Грамматика алтайского языка, составленная членами Алтайской духовной миссии. — Казань, 1869.
- Дыренкова Н. П. Грамматика ойротского языка. — М.-Л., 1940.
- Тощакова Т. М. Грамматика ойротского языка. — Новосибирск, 1939.
- Исследования по алтайскому языку: Сборник научных трудов/ Под ред. А. Э. Чумакова. — Горно-Алтайск: РИО ГАГУ, 2003. — 160 с.
- Ерленбаева Н. В. Бытовая лексика алтайского языка. — Горно-Алтайск: РИО ГАГУ, 2008. — 184 с.


### Lüğətlər


- Баскаков Н. А., Тощакова Т. М. Ойротско-русский словарь. С приложением краткого грамматического очерка ойротского языка Н. А. Баскакова. — М., 1947.
- Вербицкий В. И. Словарь алтайского и аладагского наречий тюркского языка. — Казань, 1884.
- Коргунбаева Н. И. Алтайско-русский — русско-алтайский словарь. — Горно-Алтайск, 1991.

## İstinadlar


1. Всероссийская перепись населения 2002 года. Том 13. «Коренные малочисленные народы Российской Федерации» (http://perepis2002.ru/index.html?id=44)
2. https://azerdict.com/izahli-luget/topa
3. https://azerdict.com/izahli-luget/yovuq
4. https://obastan.com/az/dict/dialect/word/566718-QOYU
5. https://azerdict.com/izahli-luget/%C3%B6ks%C3%BCz
6. https://azerdict.com/izahli-luget/%C9%99s%C9%99n
7. http://www.tdk.gov.tr/index.php?option=com_bts&view=bts&kategori1=veritbn&kelimesec=115975
8. https://obastan.com/az/search/?q=s%C9%99miz
9. https://azerdict.com/az/izahli-luget/%C3%B6yr%C9%99nci
10. https://azerdict.com/izahli-luget/tumov
11. https://obastan.com/az/search/?q=t%C4%B1r%C4%B1q
12. https://azerdict.com/izahli-luget/ishal
13. https://azerdict.com/izahli-luget/q%C9%99biz
14. https://azerdict.com/izahli-luget/ya%C5%9Fmaq
15. https://azerdict.com/izahli-luget/ya%C5%9F%C4%B1rmaq
16. https://obastan.com/az/dict/dialect/word/573918-YAR
17. https://azerdict.com/izahli-luget/qat
18. https://www.altai-tour.ru/about_altai/natsionalnaya-kukhnya/kurut/
19. https://azerdict.com/izahli-luget/üzəngi
20. https://azerdict.com/izahli-luget/yed%C9%99k
21. https://azerdict.com/izahli-luget/yor%C4%9Fa
22. https://obastan.com/az/search/?q=ar%C4%9Fal%C4%B1
23. https://azerdict.com/izahli-luget/t%C3%BCt%C3%BCn
24. https://azerdict.com/izahli-luget/ay%C4%B1tmaq
25. http://obastan.com/az/dict/dialect/word/570601-S%C6%8FS%C4%B0YM%C6%8FX%E2%80%99
26. https://azerdict.com/izahli-luget/sovurmaq
27. https://azerdict.com/izahli-luget/h%C3%BCrkm%C9%99k
28. https://azerdict.com/izahli-luget/qaxmaq
29. https://azerdict.com/izahli-luget/batmaq
30. https://azerdict.com/izahli-luget/yortmaq
31. https://azerdict.com/izahli-luget/yort
32. https://obastan.com/ru/search/?q=toxtamaq
33. https://azerdict.com/izahli-luget/t%C3%BCl%C9%99m%C9%99k
34. https://obastan.com/az/dict/dialect/word/564158-%C4%B0DMAX
35. https://azerdict.com/izahli-luget/yoluxmaq




**Türk dilləri**

Qədim türk dili †

| | |
|---|---|
| **Bulqar dilləri** | ▪ qədim: Avar (türk) dili †¹ • Bulqar dili † • Hun dili †¹ • Xəzər dili †¹<br>▪ müasir: Çuvaş dili (dialektləri: üst dialektləri, alt dialektləri; Malokaraç ləhcəsi) |
| **Qədim türk dilləri** | ▪ Qədim qırğız (Yenisey-qırğız) dili † • Orxon-Yenisey (qədim türk) dili • Uyğur runa (Orxon-uyğur) dili † |

| | |
|---|---|
| **Dağlıq Altay (mərkəzi-şərqi) dilləri**[1] | ▪ Qırğız-qıpçaq dilləri[3]: Qırğız dili (Şimali qırğız dili dialektləri, Fərqanə-qıpçaq dili (†), Cənubi qırğız dili dialektləri) • Tubalar dili[2] • Cənubi Altay dili (dialektləri: Sibir tatar - cənubi Altay dialektləri[1], Əsl Altay dili (oyrot, Altay-kiji), Telengit ləhcəsi, Teleut ləhcəsi)<br>▪ Şimali Altay dilləri[1]: Şor dilinin kondom dialekti[2] • Çulım dilinin aşağı çulım dialekti[2] • Şimali Altay dili (dialektləri: Kumandin ləhcəsi, Çelkan ləhcəsi) • Sibir tatar dili - Şimali Altay dialektləri |
| **Qarluq dilləri**[1] | ▪ Qədim qarluq dili †<br>▪ Qarluq-uyğur dilləri[1]: Qədim uyğur dili † • Qaraxani (qaraxani-uyğur) dili † • Xələc dili (arğu)[1]<br>▪ Qarluq-Xorəzm dilləri[1]:<br>  ▪ **ədəbi qədim yazılı** — Xorəzm-türk dili † • Çağatay dili † • Türki dili † (Povolj türkisi)[1]<br>  ▪ **müasir** — Ayni (əynu) dili ‡[2] • İli-türk dili[1] • Lobnor dili ‡[1] • Sibir tatar dili — qarluq dialektləri[1] • Özbək (qarluq) dili • Uyğur (yeni uyğur) dili (dialektləri: Xotan dili) • Xoton dili (†) ‡[1] • Cənubi qırğız — qarluq dili dialektləri[2] |
| **Qıpçaq dilləri** | ▪ Qədim qıpçaq dili †<br>▪ Noqay-qıpçaq dilləri — Alabuqat-noqay dili[2] • Həştərxan-noqay dili[2] • Qazax dili • Qaraqalpaq dili • Noqay dili • Sibir tatar — noqay dialektləri[1] • Krım-tatar dilinin çöl dialekti • Özbək-noqay dili (özbək dilinin qıpçaq dialektləri) ‡[2] • Fərqanə-qıpçaq — noqay-qıpçaq dielktləri[2] • Cənubi qırğız dili — noqay-qıpçaq dialektləri[2] • Yurtov-noqay dili[2]<br>▪ Povolj-qıpçaq dilləri — Başqırd dili • Sibir tatar dili[1] (dialektləri: Baraba dili, Tobol-irtış dialekti, Tom dialekti) • tatar-başqırd idiomu[2] • tatar dili (dialektləri: Kazan dialekti, Mişar dialekti; Kryaşen dialekti[1])<br>▪ Poloves-qıpçaq dilləri — Qədim polovets (Kuman) dili † • Qəraim dili (dialektlər: Qal dialekti, Krım dialekti[1], Traka dialekti) • Krım-tatar (Ədəbi dili, Krımçaq dili[2], Krım-tatar dilinin orta dialekti, Urum (azovyanı) — qıpçaq şivələri[2]) • Qafqaz[1] (Erməni-qıpçaq dili †, Qaraçay-balkar dili, Qumuq dili) • Məmlük-qıpçaq dili †[1] |
| **Oğuz dilləri** | ▪ Qədim oğuz dili †<br>▪ Pəçənək dili †[1] • Salar dili • Şimali özbək (ikan-qarabulağ) dili[1]<br>▪ **Oğuz dilləri** — Azərbaycan dili (dialektləri, Türk-tatar dili) • Aynallu[2] • Əfşar dili[2] • Balkan-qaqauz dili • Qaqauz dili • Qaşqay dili[2] • Osmanlı dili † • Səlcuq dili[2] • Suriya-türkmən dialektləri[2] • Kirmanşahın Sunqur şivəsi • Türk dili (dialektləri: Kipr dialekti, Salk dili) • Türkmən dili (dialektləri: Truxmən dili) • Urum (azovyanı) — oğuz şivələri • Xorasan-türk dili (dialektləri: Bocnurdi dili) • Xarəzm dili (özbək dilinin oğuz dialektləri)[2] • Krım-tatar dilinin cənub sahil dialekti |
| **Sayan (tobas) dilləri** | ▪ **çol dilləri** — Kök-monçak dili • Tıva dili • Səngəl dili<br>▪ **tayqa dilləri** — Şərqi tıva dili dialektləri[2] • Soyot-satan dili (dialektləri.: soyot, uryanxay, satan) • Tofalar dili |
| **Xakas (qırğız) dilləri** | ▪ Sarıq-yuqur (xara-yoqur) dilləri • Fuyuy-qırğız dili<br>▪ **Xakas-altay (əsl Xakas) dilləri** — Şor dilinin mras dialekti[2] • Çulım dilinin orta çulım dialekti[2] • Xakas dili (dialektləri: kaçin dialekti, Qızıl dialekti, Saqay dialekti, Şor dialekti) |
| **Yakut dilləri** | ▪ "A"laşan yakut dili dialektləri • "O"laşan yakut dili dialektləri, o cümlədən |

| | |
|---|---|
| | Dolqan dili², Ədəbi yakut dili |
| **Qarışıq türk dilləri və dil qrupları** | Altay (Dağlıq Altay, Oyrot) dili • Krım-tatar dili • Sibir tatar dili • Özbək dili • Urum (azovyanı) dili • Fərqanə-qıpçaq dili (†) • Çulım dili • Şor dili • Cənubi qırğız dili dialektləri<br>▪ qarışıq dil qrupları: Qarluq dilləri • xakas, şimali Altay və qırğız-qıpçaq dillərinin birləşməsi |
| **Yazısı** | Orxon-Yenisey runaları • Bolqar runaları • Yanalif • Qədim uyğur yazısı |

**Qeyd**: ¹ dilin və ya dil qrupunun təsnifatı mübahisəlidir, dil və ya dil qrupu hipotetikdir (bax: Türk dillərinin təsnifatı); ² "dil" terminin tətbiqi mübahisəlidir, "Dil və dialekt" problemi; ³ mümkündür ki, qıpçaq dilidir; † Ölü, bölünmüş və ya dəyişilmiş dillər; (†) Mümkündür ki, ölü dildir; ‡ qarışıq dillər

**Rusiya Federasiyasının subyektlərində dövlət dilləri və rəsmi dillər**

| | |
|---|---|
| **Federal dil** | Rus dili |
| **Federasiyanın subyektlərinin dilləri** | Abaza dili • Adıq dili • Ağul dili • Altay dili • Avar dili • Azərbaycan dili • Başqırd dili • Buryat dili • Çeçen dili • Çuvaş dili • Dargin dili • Erzyan dili • Xakas dili • İnquş dili • Kabardin-çərkəz dili • Kalmık dili • Komi dili • Qaraçay-balkar dili • Qumuq dili • Lak dili • Ləzgi dili • Noqay dili • Mari dili • Mokşan dili • Osetin dili • Rutul dili • Saxur dili • Tabasaran dili • Tat dili • Tatar dili • Tuva dili • Udmurt dili • Yakut dili |
| **Rəsmi statuslu dillər** | Dolqan dili • Çukot dili • Even dili • Evenk dili • Fin dili • Xantı dili • Karel dili • Komi-perm dili • Qazax dili • Mansi dili • Nenes dili • Selkup dili • Veps dili • Yukagir dili |